WIKIPEDIA

# Okeaniya

Vikipediya, azad ensiklopediya

**Okeaniya** — Sakit Okean adalarının və bəzən Avstraliyanın da aid edildiyi coğrafi və geosiyasi bölgə.

## Okeaniya



21° c. e. 166° ş. u.

| Tarixi və coğrafiyası | |
|---|---|
| **Sahəsi** | 8.525.989 km² |
| **Saat qurşağı** | UTC−08:00[1] |
| | UTC−10:00[1] |
| | UTC+09:00[1] |
| | UTC+10:00[1] |
| | UTC+11:00[1] |
| | UTC+12:00[1] |
| | UTC+13:00[1] |
| | UTC−09:00[1] |
| | UTC−09:30[1] |
| **Əhalisi** | |
| **Əhalisi** | 36.659.200 nəf. () |




## Mündəricat



## Coğrafiyası

Okeaniya Sakit okeanın mərkəzi və qərb hissəsində yerləşən adalar qrupuna verilən addır. Ümumi sahəsi 1.3 mln km-ə bərabər olan 7 minə qədər adanı özündə birləşdirir. Coğrafi cəhətdən Şimal yarımkürəsinin subtropik qurşağından Cənub yarımkürəsinin mülayim qurşağına qədər ərazidə yerləşmişdir. Sakit Okean səthinin 2%`-i Okeaniya adalarının payına düşür. Adaların sahəsinin çox hissəsi Yeni Qvineya, Yeni Zelandiya, Havay, Fici, Tuamotu və s. adalarını əhatə edir. Okeaniya adaları belə qruplaşdırılır:

1. Melaneziya (yunanca - "qara adalar")
2. Mikroneziya (yunanca - "kiçik adalar")
3. Polineziya (yunanca - "çoxlu adalar")
4. Yeni Zelandiya - İki böyük və bir neçə xırda adadan ibarətdir.

Okeaniya avropalılara XVI əsrdən Fernan Magellanın ilk dünya səyahəti zamanından məlum olmuşdur. Adaların kəşfində və öyrənilməsində Ceyms Kukun, Abel Tasmanın, Fyodor Litkenin, Nikolay Mikluxo-Maklayın, Tur Heyerdalın və başqalarının xidmətləri var.

## Təbiəti

Vikianbarda əlaqəli mediafayllar


Okeaniya

Burada materik, vulkan və mərcan mənşəli adalar var. Lakin vulkan və mərcan mənşəli adalar daha çoxdur. Qərb hissədə Okeaniya adaları litosfer tavalarının sərhəddində yaranmış adalar qövsündə yerləşir. Adaların əksər hissəsi ekvatorial, tropik və subtropik qurşaqlarda yerləşmişdir. Yalnız Yeni Zelandiya və ona yaxın adalar subtropik və mülayim qurşaqlar daxilində qalır. Okeaniyanın iqlimi isti və yumşaq olub insan həyatı və fəaliyyəti üçün əlverişlidir. Ekvatora yaxın yerləşdiklərinə görə , adalarda ilboyu havanın yüksək temperaturu olur. Lakin okeandan əsən küləklər havanı xeyli yumşaldır. Temperaturun sutkalıq və illik tərəddüdü azdır. Okeaniya adaları digər ərazilərdən təcrid olunduğuna görə üzvi aləmi kasıbdır. Mərcan mənşəli kiçik adalarda içməli su, torpaq örtüyünün zəif inkişafı bitki və heyvanlar aləminin kasad olmasına səbəb olub. Materik və vulkan mənşəli adalarda isə üzvi aləm zəngindir. Məsələn, Yeni Qvineya adasında **20 000`ə qədər bitki növü** var. Dağlarda hündürlük qurşaqları yaranır. Küləyə tərəf olan yamaclar bol yağıntı alır. Heyvanlar aləmində yırtıcılar və ilanlar yoxdur. Mezozoy erası dövründə cənub-şərqi Asiyadan ayrılmış materik üçün kisəlilər ailəsinə mənsub olan heyvanlar xarakterikdir. Avropalıların gəlişinə qədər burada kenquru, ayı, qarışqa yeyən, dələ, köstəbək, yexidna və dinqo tipli vəhşi itlər yayılmışdı. Burada qanadlı quşlardan;Avstraliyanın gerbində öz əksini tapmış qara rəngli ququşu və digər ov quşlarına, habelə dəvəquşuna rast gəlinir.

## Əhalisi

İnsanların Okeaniya adalarında məskunlaşmasının bir neçə min əvvəl baş verdiyi güman edilir. Onların bura necə gəldiyi haqda bir neçə fərziyə var. Bir fərziyəyə görə, insanlar Okeaniya adalarına Cənub-Şərqi Asiyadan gəliblər. Müasir Norveç səyyahı Tur Heyerdal`a görə isə yerli əhali Cənubi Amerikadan köçüb gələnlərdir. Hazırda Okeaniya əhalisi yerlilərdən, gəlmələrdən və qarışıq nəsillərdən ibarətdir. Yerli əhali bir birindən təkcə irqinə görə deyil, həmçinin dilinə və məişətinə görə də fərqlənir. Melaneziya adalarında (Yeni Qvineya, Solomon, Fici, və s.) ekvatorial irqə mənsub olan **papuaslar** məskunlaşmışlar. Mikroneziya və Polineziyada isə xüsusi Polineziya qrupuna aid edilən xalqlar yaşayırlar. Onlar papuaslardan dərilərinin rənginin bir qədər açıq olması, buruq saçları ilə fərlənirlər. Yeni Zelandiyanın yerli əhalisi **maori** adlanır. Lakin əhalinin çoxunu Böyük Britaniyadan gələnlər təşkil edir. Okeaniyanın müasir əhalisi başlıca olaraq əkinçiliklə məşğul olur, kokos palması, banan, ananas, şəkər qamışı və s. bitkilər becərir. Balıqçılıq təsərrüfatı burada ənənəvi sahə hesab olunur. Adalarda əlvan metallar, daş kömür, fosforit, və s. faydalı qazıntılar hasil edilir. Okeaniya uzun müddət müstəmləkə olmuşdur. Burada yalnız Yeni Zelandiya müstəqil dövlət idi. Hazırda müstəqil dövlətlərin sayı 15-dən çoxdur. Qalan adalar isə ABŞ, Fransa, Avstraliya və s. dövlətlərin müstəmləkələri olaraq qalır.

## Mənbə


1. Y.Mahmudlu - Dünya xalqlarının etnoqrafiyası - Bakı, 1999, 506 səh.
2. Alxasov O.K., Ələsgərov D.M., Pənahov Ş.M., Məmmədov R.İ. "Materiklərin və okeanların fiziki coğrafiyası" (VII sinif dərsliyi). Bakı, "Təhsil", 2002, 252səh.

1. http://www.worldatlas.com/webimage/countrys/oceania/oceaniatimes.htm (http://www.worldatlas.com/webimage/countrys/oceania/oceaniatimes.htm)